"Azərbaycan Dövlət Pedaqoji Universitetinin mətbu orqanı"

# GƏNC MÜƏLLİM QƏZETİ



H.Əliyev
"Müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda, ikiqat məsuliyyətli işdir!"



AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ




Vətən müharibəsi şəhidlərinin xatirə abidəsi, Füzuli rayonu, Qaraxanbəyli kəndi.

27 sentyabr 2022-ci il.

**İlham Əliyev:** *"Bu gün Azərbaycanda Anım Günüdür. Bütün Azərbaycan xalqı şəhidlərimizin aziz xatirəsini yad edir. Allah bütün şəhidlərimizə rəhmət etsin. Şəhidlərimiz Vətən, torpaq uğrunda öz canlarını fəda etdilər. Biz öz şəhidlərimizlə fəxr edirik".*




Azərbaycan Respublikasının Prezidentinin müvafiq Sərəncamı ilə 2023-cü il "Heydər Əliyev ili" elan edilib.



SON 6 İL ƏRZİNDƏ ADPU-NUN QƏBUL PLANI 2200 NƏFƏRDƏN 2470-Ə, QƏBUL PLANININ DOLMA DƏRƏCƏSİ 94 FAİZDƏN

**100 FAİZƏ QALXIB.**



Azərbaycan Respublikası Nazirlər Kabinetinin 12 avqust 2022-ci il 302 nömrəli qərarı ilə Azərbaycan Dövlət Pedaqoji Universiteti publik hüquqi şəxsə çevrildi.



AZƏRBAYCAN RESPUBLİKASI
ELM VƏ TƏHSİL NAZİRLİYİ

Azərbaycan Respublikasının Prezidentinin 28 iyul 2022-ci il tarixli Fərmanı ilə Azərbaycan Respublikasının Təhsil Nazirliyi Azərbaycan Respublikasının Elm və Təhsil Nazirliyi adlandırılıb.

*1921-ci ildən təhsilimizin keşiyində...*

Qəzet 1958-ci il, fevral ayının 1-dən etibarən nəşr olunur. | Sentyabr, 2022 / № 13 (1116)

## ADPU-NUN BUİLKİ MƏZUNLARININ MƏŞĞULLUĞU 71 FAİZ TƏŞKİL EDİB

Sentyabrın 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının iclası keçirilib. Əvvəlcə sentyabrın 12-dən 13-nə keçən gecə erməni silahlı qüvvələrinin dövlət sərhəddi boyu genişmiqyaslı təxribatı nəticəsində şəhid olmuş hərbçilərimizin xatirələri bir dəqiqəlik sükutla yad edilib. Açılış nitqi ilə çıxış edən rektor professor Cəfər Cəfərov qeyd edib ki, qüdrətli Azərbaycan ordusu hiyləgər düşmənə Azərbaycan Respublikasının Prezidenti, Müzəffər Ali Baş Komandan İlham Əliyevin "Dəmir Yumruğ"unun yerində olduğunu bir daha göstərdi və düşmənə "Qətiyyətli cavab" verdi.



Pedaqoji Universitetin yeni tədris ilinə hazırlaşmasından danışan rektor qeyd edib ki, universitetdə son illərdə aparılan ardıcıl islahatların nəticəsində bu il ilk dəfə olaraq 2470 nəfərlik qəbul planı 100 faiz dolub, müəllimlik ixtisaslarının ümumi nüfuzu xeyli yüksəlib. O, deyib ki, son 6 il ərzində universitetin qəbul planı 2200 nəfərdən 2470-ə yüksəlməklə yanaşı qəbul planının tam dolması da artan keyfiyyətin göstəricidir. Prof. C.Cəfərov Nazirlər Kabinetinin qərarı ilə ADPU-nun artıq publik hüquqi şəxs kimi fəaliyyət göstərəcəyini və bununla bağlı zəruri addımların atıldığını bildirib. Tədris işləri üzrə prorektor dosent Eldar Aslanov ADPU-nun 2022/2023-cü tədris ilinə hazırlığın vəziyyəti haqqında geniş məruzə ilə çıxış edərək bildirib ki, ali təhsil müəssisəsində kəmiyyət və keyfiyyət artımının təmini istiqamətində görülən ardıcıl tədbirlər nəticəsində həm universitetə qəbulda, həm də məzunların məşğulluğunun təmin edilməsi sahəsində real müsbət dinamika müşahidə olunur.

Prorektor bildirib ki, cari ildə universitetdən məzun olan təxminən 1969 nəfərin 71 faizinin məşğulluğu təmin olunub. Xatırladaq ki, ötən il bu göstərici 63 faiz təşkil edirdi. Onlar əmək bazarına atılaraq bir qismi MİQ vasitəsilə dövlət ümumtəhsil məktəblərində, bir qismi özəl təhsil müəssisələrində, digər qismi isə qeyri-pedaqoji dövlət və özəl təşkilatlarda fəaliyyət göstərir, habelə, məzunlardan 390 nəfər (20 faizi) magistratura səviyyəsində ölkəmizdə və xaricdə (52 nəfəri) təhsillərini davam etdirirlər ki, onların seçdikləri xarici ölkələrin içərisində Türkiyə, ABŞ, İtaliya, Almaniya, Cənubi Koreya, İsrail kimi ölkələr yer alır. Dos. E.Aslanov bildirib ki, cari ildə həm ADPU-nun qəbul planı, həm də Pedaqoji Kollecin 11 illik bazada qəbul planı 100 faiz dolub, o cümlədən magistratura səviyyəsində təxminən 399 nəfərlik plan yeri 93 faiz dolub. E.Aslanov xüsusilə vurğulayıb ki, bu il universitetə qəbul olunan tələbələrin 70 faizi dövlət hesabına təhsil alacaq. Məruzədə qeyd olunub ki, ali təhsil müəssisələrinə tələbə qəbulunun nəticələrinə görə ölkə üzrə təhsil ixtisaslarına ayrılan 10298 plan yerinin 25 faizi Pedaqoji Universitetin payına düşür və ADPU payı daha da artırmaq istiqamətində uğurlu fəaliyyət göstərir. ADPU-da təlim mühitinin və əməkdaşların sosial vəziyyətinin yaxşılaşdırılmasından danışan prorektor diqqətə çatdırıb ki, son 6 il ərzində professor-müəllim heyətinin əmək haqqında təxminən 34-43 faiz arası artım olub və əmək haqqının mütəmadi artırılması, həmçinin



maddi-texniki təchizatın yaxşılaşdırılması üçün tədbirlər davam etdirirlir. Cari tədris ilindən etibarən auditoriyalarda yeni ağıllı lövhələrin quraşdırılmasına başlanılıb. Yekunda dos. E.Aslanov qeyd edib ki, hazırda ADPU-da institusional və proqram akkreditasiyası, universitetin 2030-cu ilədək olan strateji planının təsdiqi kimi mühüm vəzifələrin icrası üzərində iş aparılır.

Sosial və humanitar məsələlər üzrə prorektor professor Fikrət Rzayev çıxışında ümummilli lider Heydər Əliyevin 100 illik yubileyi ilə bağlı ADPU-da Təşkilat Komitəsinin yaradılması haqqında məlumat verib.

Daha sonra rektorun müşaviri Ümid Mehdiyev ADPU-nun 2022/2023-cü tədris ili üçün strukturunun və ştat vahidlərinin təsdiq edilməsi haqqında məruzə edib. Məruzədə universitetdə aparılan struktur optimallaşdırmaları haqqında məlumat verib.

Elmi Şuranın iclası cari məsələlərin müzakirəsi ilə davam etdirilib.

## REKTOR "ZƏFƏR" ORDENLİ MİLLİ QƏHRƏMANIN TƏLƏBƏ ADI QAZANAN QIZI İLƏ GÖRÜŞÜB



Sentyabrın 6-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru professor Cəfər Cəfərov Azərbaycanın Milli Qəhrəmanı, "Zəfər" ordenli Vətən müharibəsi şəhidi Şükür Həmidovun qızı Əzizə Həmidova ilə görüşüb.

Əzizə bu il qəbul imtahanlarında iştirak edərək uğurlu nəticə əldə edib və ali məktəb seçimlərində Pedaqoji Universitetin ibtidai sinif müəllimliyi ixtisasını seçib. Rektor prof. C.Cəfərov qeyd edib ki, Şükür Həmidov kimi igidlərimiz sayəsində bu gün vətənimiz azaddır. Biz hər birimiz şəhidlərimizə borcluyuq və çox qürurluyuq ki, Milli Qəhrəmanımızın yadigarı təhsilini bizim universitetdə davam etdirəcək.

Şükür Həmidovun ibrətamiz həyat yolundan danışan rektor onun Aprel döyüşlərində və Vətən müharibəsində göstərdiyi misilsiz şücaətlərdən söz açıb və qəhrəmanın bizlərə əmanət olan övladının ADPU-da yüksəkixtisaslı müəllim kimi yetişəcəyinə əmin olduğunu ifadə edib. Pedaqoji Universitetin ölkəmizin ən böyük, qədim və yüksək nüfuza malik universitetlərindən biri olduğunu vurğulayan C.Cəfərov bildirib ki, son illər ərzində aparılan məqsədyönlü dövlət siyasətinin və ADPU-da icra olunan islahatların nəticəsində müəllim peşəsinin nüfuzu sürətlə artır. Təsadüfi deyildir ki, cari ildə Dövlət Pedaqoji Universitetinin qəbul planı tam dolmuş, universitetə kifayət qədər yüksək balla tələbə qəbul edilmişdir. Universitetin sosial və humanitar məsələlər üzrə prorektoru professor Fikrət Rzayev də öz növbəsində Əzizəni təbrik edərək onun ADPU-da təhsil alması üçün hərtərəfli tədris və zəngin tələbə mühitinin olduğunu vurğulayaraq, universitetin sosial həyatı haqqında məlumat verib.

İbtidai təhsil fakültəsinin dekanı professor Fərrux Rüstəmov fakültə haqqında danışaraq qəhrəmanımızın övladının əmin əllərdə olduğunu bildirib. Görüşdə iştirak edən Şükür Həmidovun qardaşı Əsəd Həmidov göstərilən yüksək diqqətə görə təşəkkür edərək bildirib ki, Əzizənin babası Nəriman Şükürov da, anası Könül xanım da müəllimdir. Əzizənin də müəllim olmasının qardaşının ən böyük arzusu olduğunu deyən Ə.Həmidov bunun üçün ən doğru seçimin Pedaqoji Universitet olduğunu qeyd edib.

Qəhrəmanımızın övladı Əzizə də öz növbəsində atasının torpaqlarımızın azadlığı uğrunda şəhid olduğunu və onun azad elədiyi bu müqəddəs vətənə daha yaxşı xidmət etmək üçün əlindən gələni edəcəyini, təhsilində daim irəlidə olacağını vurğulayıb.

Qeyd edək ki, Milli Qəhrəmanın qardaşı Ə.Həmidovun qızı Gülşüm Həmidova da ADPU-nun ibtidai sinif müəllimliyi ixtisası üzrə eksperimental ingilis dilli qrupun IV tədris ili tələbəsidir.

Daha sonra görüş çay süfrəsi ətrafında səmimi söhbətlə davam edib.

Görüşün sonunda rektor prof. C.Cəfərov Əzizəyə universitetin atributlarını, yubiley nəşrləri və qiymətli hədiyyələr təqdim edib.

## ADPU REKTORU BİRİNCİ TƏDRİS İLİNİN TƏLƏBƏLƏRİ İLƏ GÖRÜŞÜB





Sentyabrın 15-də ADPU rəhbərliyi universitetə yeni qəbul olunmuş tələbələrlə görüşüb.

Rektor professor Cəfər Cəfərov, prorektorlar və müvafiq fakültə dekanları tədris auditoriyalarında birinci tədris ilinin tələbələri ilə görüşərək onları tələbə adını qazanmaları və müəllimlik peşəsini seçdikləri üçün təbrik ediblər. Tələbələrlə öz fikirlərini bölüşən prof. C.Cəfərov son günlər ərzində ermənilərin genişmiqyaslı təxribatı nəticəsində hərbi qulluqçularımız arasında şəhidlərin olmasını qeyd edərək, şəhidlərimizə Allahdan rəhmət diləyib, onların qanının yerdə qalmadığını vurğulayıb. Rektor bildirib ki, bu gün bütün gənclərimiz informasiya savaşında ayıq və aktiv olmalı, eyni zamanda öz ixtisaslarını dərindən mənimsəmək üçün məsuliyyətlə çalışmalıdırlar. Rektor prof. C.Cəfərov diqqətə çatdırıb ki, Pedaqoji Universitetdə tələbələrin yüksəkixtisaslı kadr kimi yetişməsi, müasir dövrün tələblərinə cavab verən tədris mühitinin yaradılması istiqamətində xeyli imkanlar var və bu imkanlar durmadan təkmilləşdirilir.

C.Cəfərov qeyd edib ki, tələbələr peşəkar alimlərdən dərs almaq imkanı ilə yanaşı universitetin sosial həyatında aktiv iştirak edə, tələbə təşkilatlarında fəaliyyət göstərə, o cümlədən, operativ sosial media hesabları və veb səhifə üzərindən ən son məlumatları ala və onları maraqlandıran bütün suallara yerindəcə cavab ala bilərlər.

# PEDAQOJİ UNİVERSİTETƏ YÜKSƏK NƏTİCƏ İLƏ QƏBUL OLUNAN TƏLƏBƏLƏRLƏ GÖRÜŞ KEÇİRİLİB

**Ən gənc** abituriyent **bizi** seçdi



Məmmədova Əsmər
Abbas qızı
15 yaş

**Yüksək bal** toplayan **əkiz bacıları** bizi seçdi



Tağızadə Zümrüd
Cəbrayıl qızı
651.9 bal



Tağızadə Yaqut
Cəbrayıl qızı
586.3 bal




**Yüksək balla** bizi seçənlər



Nağıyeva Sevinc
Cavanşir qızı
617.1 bal



Məmmədova Leman
Mehman qızı
616.3 bal



Abuzərova Tünzalə
Rəhim qızı
607.9 bal



Hüseynova Fatimə
Cavanşir qızı
601 bal

Sentyabrın 15-də cari tədris ilində ADPU-ya yüksək nəticə ilə qəbul olunan tələbələrlə görüş keçirilib. Görüşdə universitetin rektoru professor Cəfər Cəfərov, tədris işləri üzrə prorektor dosent Eldar Aslanov, sosial və humanitar məsələlər üzrə prorektor professor Fikrət Rzayev, universitet və fakültələr üzrə ən yüksək nəticə ilə universitetə qəbul olunan tələbələr iştirak ediblər.

Bu il ADPU-nun bakalavr və magistratura pilləsinə daxil olan tələbələr arasında kifayət qədər yüksək nəticə göstərən abituriyent var. Onların arasında bu il ölkəmizin ən gənc tələbəsi olan 15 yaşlı Əsmər Məmmədova, 651.9 balla ADPU-ya qəbul olunan Zümrüd Tağızadə və 586,3 balla ADPU-nu seçən onun əkiz bacısı Yaqut Tağızadə kimi tələbələr də var. Ümumilikdə cari ildə Pedaqoji Universiteti seçən tələbələr arasında 5 nəfəri 600-dən, 211 nəfəri isə 500-dən yüksək bal toplayıb. Tanışlıq xarakterli görüşdə rektor prof. C.Cəfərov çıxış edərək tələbələri yüksək nailiyyət əldə etmələri və xüsusən ADPU-da peşəkar müəllim olmağı seçmələri münasibəti ilə təbrik edib. Rektor nitqində universitet haqqında geniş məlumat verərək ölkəmizin ən qocaman və böyük, nüfuzlu ali təhsil ocaqlarından olan ADPU-nun müəllim hazırlığında flaqman rolunu vurğulayıb və bildirib ki, hər il yüksək balla universiteti seçən tələbələrin dinamikasındakı artım da ADPU-da aparılan islahatların və müəllim peşəsinin nüfuzunun qalxmasının göstəricisidir. C.Cəfərov diqqətə çatdırıb ki, son altı il ərzində ADPU-nun qəbul planı 2200 nəfərdən 2470 nəfərə qədər artıb və bu il ilk dəfə olaraq plan yeri tamamilə, 100 faiz dolub.

Öz növbələrində yüksək nəticə göstərən tələbələr də öz təəssüratlarını bölüşərək yüksək nəticə ilə müəllimlik ixtisaslarını seçməyin artıq təsadüfdən hədəfə çevirildiyini, özlərinin də bu hədəfə çatdıqları üçün xoşbəxt olduqlarını vurğulayıblar. Tələbələr ADPU-da arzusunda olduqları müəllimlik sənətinin incəliklərinə dərindən yiyələnəcəklərini ifadə edərək bu sahəni seçmələrində ADPU-nun müsbət imicinin, onlara dərs deyən müəllimlərinin və ailələrinin tövsiyələrinin rolundan, müəllimlik sənətinə olan sevgilərindən danışıblar.

Görüş səmimi söhbət formatında davam etdirilib. Sonda tələbələrə universitetin atributları hədiyyə olunub.

## ÜMUMMİLLİ LİDER HEYDƏR ƏLİYEVİN ELMİ-SİYASİ İRSİNIN ÖYRƏNİLMƏSİ ÜZRƏ MƏKTƏBİN NÖVBƏTİ DƏRSİ KEÇİRİLİB

ADPU-da "Biz Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin elmi-siyasi irsini öyrənirik" adlı məktəbin növbəti – üçüncü dərsi keçirilib.

Dərsdən əvvəl məktəbin müdavimləri ali təhsil ocağının Heydər Əliyev muzeyində ekskursiyada olublar. Sonra keçirilən tədbirdə ulu öndər Heydər Əliyevin və Azərbaycanın ərazi bütövlüyü uğrunda mübarizədə canlarından keçmiş şəhidlərin xatirəsi bir dəqiqəlik sükutla yad edilib, onlara Allahdan rəhmət, qazilərimizə şəfa dilənib.



Daha sonra çıxış edən YAP Səbail rayon təşkilatının sədri Muxtar Nağıyev bu cür tədbirlərin keçirilməsinin və gənclərin Heydər Əliyev irsi barədə geniş məlumata sahib olmasının əhəmiyyəti barədə danışıb.

Pedaqoji Universitetin rektoru, professor Cəfər Cəfərov çıxışında Heydər Əliyev irsinin elmi, pedaqoji, siyasi baxımdan çox genişrakurslu olduğunu, bu irsin nə qədər araşdırılsa da, yenindən araşdırılmağa və yeni məlumatlar öyrənməyə kömək etdiyini xatırladaraq bildirib: "Ulu öndər Heydər Əliyev hər zaman gənclərə xalqın gələcəyi kimi baxıb və onların yaxşı təhsil almasının vacibliyini vurğulayıb. Bu istiqamətdə də hər zaman böyük addımlar atıb. Bu məsələ Prezident İlham Əliyevin yürütdüyü siyasətdə də əsas istiqamətlərdən biridir. Son illərdə çox sayda gənc təhsil almaq üçün xarici ölkələrin qabaqcıl ali təhsil ocaqlarına göndərilib. Bütün bunlar Ulu Öndərin gənclərin xalq üçün yararlı şəxsiyyət olmasında təhsilə nə qədər önəm verdiyinin göstəricisidir".

YAP Mərkəzi Aparatının Siyasi təhlil, maarifləndirmə və seçkilərlə əlaqədar iş şöbəsinin müdir müavini, siyasi elmlər üzrə fəlsəfə doktoru Asif İmaməliyev, Əməkdar müəllim,"91-lər"in nümayəndəsi Allahverdi Hacıyev, ADPU-nun sosial və humanitar məsələlər üzrə prorektoru Fikrət Rzayev, "91-lər"in nümayəndəsi, professor Hacan Hacıyev və digərləri mövzu ətrafında fikirlərini bölüşüblər.

Çıxışlardan sonra tələbələrin sualları cavablandırılıb və maraqlı müzakirələr aparılıb.

## ADPU TGT ÜZVLƏRİ II FƏXRİ XİYABANA YÜRÜŞ EDİBLƏR



ADPU Tələbə Gənclər Təşkilatının (ADPU TGT) üzvləri II Fəxri Xiyabana yürüş ediblər. Yürüşdə 300 nəfərə yaxın tələbə iştirak edib.

Yürüş zamanı tələbələr 44 günlük Vətən müharibəsində xüsusi şücaət, misilsiz qəhrəmanlıqlar nümayiş etdirərək əzəli torpaqlarımızın azadlığı uğrunda canından keçən şəhidlərimizin məzarları önünə gül dəstələri qoymuş, şəhidlərimizin ruhu dərin ehtiramla yad edilmişdir.

Həmçinin, yürüş zamanı tələbələrə 44 günlük Vətən Müharibəsi və 2022-ci ilin 12-13 sentyabr tarixlərində baş verən döyüşlərdə şəhidlik zirvəsinə ucalmış qəhrəmanlarımız haqqında ətraflı məlumat verilib.

Tələbələr Azərbaycanın ərazi bütövlüyünün əbədi olduğunu, Azərbaycan Respublikasının Prezidenti, Silahlı Qüvvələrin Ali Baş Komandanı cənab İlham Əliyevin rəhbərliyi altında şəhidlərin qanı ilə azad olunan torpaqlarımızın daim çiçəklənəcəyini vurğulayıblar.

## REKTOR ERASMUS+ MÜBADİLƏ PROQRAMININ MƏZUNLARI İLƏ GÖRÜŞDÜ



2016-cı ildən Danimarkanın Kopenhagen Universitet Kolleci (UCC) ilə ADPU arasında Erasmus+ proqramı çərçivəsində tələbə-heyət mobilliyini həyata keçirmək məqsədilə bağlanmış müqavilə çərçivəsində tərəfdaş universitetlə (UCC) nəzərdə tutulan tələbə-müəllim heyəti mobilliyi uğurla yerinə yetirilir. Sentyabrın 26-da ADPU-nun rektoru professor Cəfər Cəfərov 2021/2022-ci tədris ilinin yaz semestri (5 ay) ərzində Erasmus+ KA1 mübadilə proqramı xətti ilə Danimarkanın UCC Universitetində mübadilə proqramında iştirak edən sosial iş ixtisasının builki məzunu Elmir Abbasov, ibtidai sinif müəllimliyi ixtisasının ingilis bölməsi üzrə IV tədris ili tələbəsi Səbinə Tağıyeva, korreksiyaedici təlim ixtisasının III tədris ili tələbələri Yaman Əliyeva və Hamed Noroozi ilə görüş keçirib. Görüşdə həmçinin Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova da iştirak edib.

Görüş əsnasında qeyd olundu ki, ADPU-nun xarici universitetlərlə əlaqələri genişləndirilir və bu proqramlardan yararlanan müəllim və tələbə heyəti ölkəmizn təhsil həyatına yeni töhfələr verəcək.

Proqramda iştirak edən tələbələr də öz təəssüratlarını bölüşərək qazandıqları təcrübələrdən bəhs edib, universitetdə və təhsil sistemimizdə müsbət dəyişikliklərdə yaxından iştirak etmək üçün biliklərini əsirgəməyəcəklərini bildiriblər.

# PEDAQOJİ UNİVERSİTETDƏ VƏTƏN MÜHARİBƏSİ ŞƏHİDLƏRİ ANILIB

Sentyabrın 27-də ADPU-da 27 Sentyabr - Anım Günü münasibəti ilə dəyirmi masa keçirilib. Əvvəlcə Ümummilli lider Heydər Əliyevin ali təhsil müəssisəsindəki abidəsinin önünə gül dəstələri qoyulub, Azərbaycanın müstəqilliyinin və tarixi zəfərimizin memarı olan dahi insanın ruhu ehtiramla yad edilib. Vətən uğrunda canlarını fəda etmiş şəhidlərimizin aziz xatirələri bir dəqiqəlik sükutla yad edilib.

ADPU-nun Heydər Əliyev Məktəbinin lektoriyasında keçirilən anım tədbirində universitet rəhbərliyi, müvafiq struktur rəhbərləri, fakültə dekanları, profesor-müəllim və tələbələr, o cümlədən qazi tələbələr, valideynlər iştirak ediblər. Çıxış edən rektor professor Cəfər Cəfərov bildirib ki, iki il bundan öncə sentyabrın 27-də Müzəffər Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi ilə rəşadətli Azərbaycan Ordusu 30 ildir əzəli torpaqlarımızı işğal altında saxlayan erməni silahlı qüvvələrinin bütün cəbhəboyu başlayan geniş təxribatlarına qarşı qətiyyətli əks-hücum əməliyyatına başladı və çox qısa müddətdə, – cəmi 44 günə bütün torpaqlarımızı düşməndən azad edərək müasir dünya hərb tarixinə silinməz zəfər tarixi yazdılar.



"Bu haqq savaşında 2907 nəfər qəhrəman övladımız şəhid oldu ki, onlar arasında Pedaqoji Universitetin də 13 tələbə-məzunu yer alır. Həmçinin, cari ilin sentyabrında zəfər tarixindən dərs almayan ermənilərin növbəti təxribatlarının qarşısı alınarkən şəhid olmuş 80 hərbi qulluqçumuz arasında ADPU-nun Ağcabədi filialında təhsil almış Namiq Məmmədli də var. Universitet olaraq, şəhidlərimiz, qazi tələbələrimiz və məzunlarımız, şəhid və qazi övladı olan tələbələrimiz daim diqqətimizdədir. Bu ehtiramın göstəricisi kimi "Pedaqoji Universitetin Qəhrəmanları" adlı ensiklopedik toplu hazırlanıb nəşr edilmişdir." - deyən prof. C.Cəfərov şəhid qanları ilə azad edilən bu vətən üçün peşəkar mütəxəssislərin hazırlanması yolunda ADPU-nun da durmadan çalışdığını vurğulayıb.

Daha sonra ADPU-nun Azərbaycan tarixi kafedrasının dosenti Mübariz Ağalarlı dəyirmi masa iştirakçıları üçün zəfər tariximizlə bağlı gebiş məruzə edib, ictimai fəal, magistrant İsmayıl Nəsirov isə Pedaqoji Universitet tələbələrinin Vətən müharibəsi dövründəki infomübarizəsindən söz açıb.

Öz növbələrində qazi tələbələrdən Cavid Abdinov, tələbə valideynlərindən "Azərbaycan Bayrağı" ordeni ilə təltif edilən Vətən müharibəsi iştirakçısı polkovnik-leytenant Taleh Əliyev də çıxış edərək öz təəssüratlarını bölüşmüş, döyüş yollarından bəhs ediblər. Mövzu üzrə çıxış edən prof. Ə.Zalov və b/m. Ə.Teymurova da Vətən müharibəsinin misilsiz tarixi zəfər olduğunu qeyd etmişlər.

# "QƏHRƏMANLAR UNUDULMUR!" – PEDAQOJİ UNİVERSİTETİN ŞƏHİD MƏZUNU ANILDI

Sentyabrın 29-da ADPU-da Kimya və biologiya fakültəsinin təşkilatçılığı ilə fakültənin Vətən müharibəsində şəhid olan məzunu Nüsrətli Ceyhun Aqil oğlu və onun timsalında torpaqlarımızın erməni işğalından azad edilməsi uğrunda canını qurban vermiş şəhidlərimizin xatirələrinə həsr olunmuş "Qəhrəmanlar unudulmur" adlı ümumuniversitet anım tədbiri keçirilib. Tədbirdə rektor professor Cəfər Cəfərov, prorektorlar, müvafiq struktur rəhbərləri, 400 nəfərədək müəllim və tələbə, həmçinin tələbə valideynləri iştirak edib. Tədbir iştirakçıları əvvəlcə universitetin foyesində Vətən müharibəsi şəhidlərinə həsr olunmuş fotosərgi ilə tanış olublar.

Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi ilə başlanan anım tədbirində vətən uğrunda canlarını fəda etmiş şəhidlərin xatirələri bir dəqiqəlik sükutla yad edilib. Açılış nitqi ilə çıxış edən fakültə dekanı dosent Elnarə Mehbalıyeva qeyd edib ki, Vətən müharibəsində şəhid olan ADPU-nun 13 məzunundan biri, fakültənin məzunu Ceyhun Nüsrətli məhz sentyabrın 29-da şəhadətə yüksəlib. Şanlı zəfər tariximiz haqqında



qısa arayış verən dos. E.Mehbalıyeva şəhidlərimizə görə nə qədər qüssələnsək də, onların qazandığı misilsiz qələbənin, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin sərkərdəliyi, xalqın birliyi və ordumuzun gücü ilə vətənin ərazi bütövlüyünün təmin edilməsinin hər birimizə sonsuz fərəh və qürur hissi yaşatdığını, Ali Baş Komandanın şəhidlərimizin, günahsız insanların qanını yerdə qoymadığını bildirib. Dekan çıxışında Pedaqoji Universitetdə şəhidlərimizin xatirəsinə həsr edilən müxtəlif tədbirlərdən söz açaraq, əksər şəhid məzunun ailələrinin ziyarət edildiyini vurğulayıb. Tədbirdə Vətən müharibəsi şəhidlərinə və şəhid Ceyhunun həyat yoluna həsr edilmiş videoçarxlar, fakültə tələbələrinin hazırladıqları "Mən şəhidəm" və "Sən azadsan" adlı ədəbi-bədii kompozisiyalar nümayiş olunub, tələbələr vətənpərlik ruhunda nitqlər söyləyib, şeir və musiqilər ifa ediblər. Tədbir Azərbaycan Ordusunun sarsılmaz gücünü əks etdirən kompozisiyanın sonunda "Qarabağ Azərbaycandır!" şüarının səsləndirilməsi ilə yekunlaşıb.

## VƏTƏN MÜHARİBƏSİNƏ HƏSR OLUNMUŞ QORELYEFİN AÇILIŞI OLUB



Universitetdə Vətən müharibəsinə həsr olunmuş qorelyefin açılışı olub

İyunun 1-də Pedaqoji Universitetin (ADPU) İncəsənət və fiziki tərbiyə fakültəsində "Şuşa ili" münasibəti ilə 44 günlük Vətən müharibəsinə həsr edilmiş qorelyefin açılışı olmuşdur. Qorelyefin müəllifi təsviri incəsənət müəllimliyi ixtisası III tədris ili tələbəsi Mahmudov Pərviz Vilayət oğludur.

Tədbirin açılışında fakültə dekanı dosent Laçın Həsənova çıxış edərək Vətən müharibəsindən və həmçinin fakültədə milli ruhun daima tələbələrə aşılanmasından danışdı. Universitet Həmkarlar İttifaqı Komitəsinin (HİK) sədri Vaqif Əliyev, Təsviri incəsənət və onun tədrisi texnologiyası kafedrasının müəllimi dos. Rais Rəsulov da öz təəssüratlarını bölüşdülər.

Tədbirdə fakültənin xor kollektivi bəstəkar Nailə Mirməmmədlinin milli ruhlu əsərlərini ifa etmişlər. Fakültənin Vətən müharibəsində iştirak etmiş qazi tələbələri Abdinov Cavid Vahid oğlu və İsaqzadə Yusif Yasər oğlu da öz xatirələrini bölüşdülər.

## ADPU TƏLƏBƏLƏRİ UNIVERSİTETLƏRARASI BƏDİİ YARADICILIQ MÜSABİQƏ-FESTİVALINDA BİRİNCİLİK QAZANIBLAR



ADPU tələbələri universitetlərarası bədii yaradıcılıq müsabiqə-festivalında birincilik qazanıblar. İyunun 22-də Azərbaycan Respublikası Təhsil Nazirliyi və Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin (ATİAHİ RK) birgə təşkilatçılığı ilə ali təhsil müəssisələrinin tələbələri arasında təşkil olunan ümummilli lider Heydər Əliyevin anadan olmasının 99-cu ildönümünə həsr olunmuş bədii yaradıcılıq müsabiqə-festivalının qaliblərinin mükafatlandırılma mərasimi keçirilib. Müsabiqə-festivalın vokal ifası nominasiyasında Riyaziyyat fakültəsinin II kurs tələbəsi Dilarə Abdullayeva I yer, aşıq musiqisi nominasiyasında SABAH qruplarının III kurs tələbəsi Nəzrin Məlikova I yer, şeir nominasiyasında Filologiya fakültəsinin I kurs tələbəsi Aytac Muradlı III yer, muğam ifası nominasiyasında Filologiya fakültəsinin II kurs tələbəsi Ülkər Paşayeva III yer, musiqi alətində ifa nominasiyasında İncəsənət və fiziki tərbiyə fakültəsinin I kurs tələbəsi Arif Səmədzadə III yer, habelə, ADPU-nun xor kollektivi III yer tutmuşlar. Qeyd edək ki, Pedaqoji Universitet tələbələrinin müsabiqədə qazandıqları göstəricilərlə digər ali təhsil müəssisələrini üstələyərək ümumi hesabda da birinci yerdədir

## STEAM FƏNNİNİN TƏKMİLLƏŞDİRİLMƏSİ İSTİQAMƏTİ ÜZRƏ TƏLİMLƏR YEKUNLAŞIB

24-25 iyun tarixlərində ADPU-nun Quba və Şamaxı filiallarında Azərbaycan Respublikası Təhsil Nazirliyi, ADPU və ADPU STEAM Mərkəzinin təşkilatçılığı ilə "Müasir təlim texnologiyalarına və beynəlxalq təcrübəyə əsaslanan yeni məzmunlu təhsilin Azərbaycan Dövlət Pedaqoji Universitetində tətbiqi" adlı qrant layihəsi çərçivəsində "Ümumtəhsil müəssisələrində STEAM fənninin təkmilləşdirilməsi" istiqaməti üzrə təlimlər keçirilib. Təlimləri ADPU-nun STEAM Mərkəzinin əməkdaşları - dos. Sevinc Cəlilova, dos. Qalib Şərifov, b/m. Gülşən Musayeva, Cavid Tapdıqlı, Lalə Mənsurova, Aysel Fərəcova və Xumarə Qəhrəmanlı aparıb.



Təlim iştirakçıları praktik olaraq 3D qələmdən, 3D printerdən və mikrobitdən istifadə ilə bağlı bilik və bacarıqlara yiyələniblər. Bununla da ADPU-nun filialllarında keçirilən silsilə təlimlər yekunlaşıb.

# UNİVERSİTETİMİZ BEYNƏLXALQ ƏMƏKDAŞLIQ İMKANLARINI SÜRƏTLƏ GENİŞLƏNDİRİR

*Kopenhagen Universitet Kollecinin coğrafiyaçı alimləri ADPU-da*

Mayın 31-də ADPU-da Danimarkanın Kopenhagen Universitet Kollecinin (UCC) Coğrafiya departamentinin nümayəndələri ilə görüş keçirilib. Görüş çərçivəsində UCC-nin Coğrafiya departamenti ilə ADPU-nun Tarix və coğrafiya fakültəsi arasında əməkdaşlıqdan razılıq ifadə olunub.

"Erasmus+" beynəlxalq mübadilə proqramı çərçivəsində Tarix və coğrafiya fakültəsinin qonağı olan UCC-nin coğrafiya üzrə akademik heyətinin üzvləri 31 may - 04 iyun tarixləri aralığında ADPU-da coğrafiya müəllimi hazırlığı prosesi ilə tanış olub, akademik, bakalavriat və magistrantlar üçün mühazirələr oxuyub, habelə Azərbaycan coğrafiyası və coğrafiyanın tədrisi texnologiyası kafedrasının təşkilatçılığı ilə ölkəmizin müvafiq tədqiqat müəssisələri və maraqlı təbiət abidələri ilə tanış olublar.

*ABŞ-nin Bakıdakı Səfirliyi və Gürcüstan universitetlərinin nümayəndələri ilə görüş keçirilib*

Görüşdə rektor prof. Cəfər Cəfərov qonaqlara ADPU-nun fəaliyyətində olan yeniliklər, ingilisdilli ixtisasların sayının çoxaldılması istiqamətində görülən işlərdən, yeni standartlara keçiddən və universitetin üzləşdiyi müasir çağırışlardan bəhs edib. Gürcüstanlı təhsil mütəxəssisləri isə təmsil etdikləri universitetlər və gürcü təhsil sistemindəki yeniliklər barədə məlumat veriblər.

ADPU əməkdaşları və gürcüstanlı qonaqlar təhsildə qarşılıqlı əlaqələrin genişləndirilməsində maraqlı olduqlarını və iki ölkənin təhsil mütəxəssislərini bir araya gətirdiyi üçün ABŞ Səfirliyinin təhsil işləri üzrə mütəxəssisi Ramina Mürşüdova minnətdarlıqlarını bildirmişlər.

*Türkiyə ali təhsil müəssisələri ilə qarşılıqlı əlaqələr genişləndirilir*

ADPU özünün strateji inkişaf istiqamətlərinə uyğun olaraq Türkiyə Respublikasının ali təhsil müəssisələri ilə əlaqələrin qurulması və genişləndirilməsi, təcrübə mübadilələrinin aparılması xüsusi əhəmiyyətə malikdir.

İyunun 3-də Türkiyənin Bartın Universiteti və Kayseri Universitetinin rəhbərliyi ilə keçirilib. İşgüzar görüşlərdə ADPU-nun rektoru professor Cəfər Cəfərov və Bartın Universitetinin rektoru Orxan Uzun "Erasmus+" və "Mövlanə" mübadilə proqramları üzrə müqavilə, o cümlədən, qarşılıqlı əməkdaşlığa dair memorandum imzalayıblar. Kayseri Universitetinin nümayəndə heyəti ilə görüşün yekununda isə rektorlar prof. Cəfər Cəfərov və Qurtuluş Qaramustafa universitetlər arasında akademik əməkdaşlığa dair protokol imzalayıblar.

*Quba filialın əməkdaşları Özbəkistanda keçirilən beynəlxalq konqresdə iştirak ediblər*

20-21 iyun tarixlərində Özbəkistan Respublikasının paytaxtı Daşkənd şəhərində VII Beynəlxalq EMI Sahibkarlıq və Sosial Elmlər Konqresi keçirilib. Tədbir TEAM Universitetinin ev sahibliyi ilə hibrid formatda təşkil olunub. Sahibkarlar, alimlər, doktorantlar, incəsənət xadimləri, QHT, dövlət və özəl sektor nümayəndələrinin iştirakı ilə keçirilən konqresin məqsədi insan, sosial və mədəni kapitalın inkişaf etdirilməsi məsələlərini müzakirə etməkdir.

Beynəlxalq konqresdə 30 ölkə üzrə 138 fərqli qurum və universitetdən 276 alim məruzələrini təqdim ediblər. Ölkəmizi beynəlxalq tədbirdə ADPU-nun Quba filialının direktoru dos. Yusif Aliyev, filialın baş müəllimi, gənc alim Sərxan Cəfərov, AMEA-nın akad. H.Əliyev adına Coğrafiya İnstitutunun baş direktoru dos. Zakir Eminov, Turizm və rekreasiya coğrafiyası şöbəsinin müdiri dos. Zaur İmrani və Xəzər Universitetinin İngilis dili və ədəbiyyatı departamentinin rəhbəri Milana Abbasova təmsil ediblər.

Qeyd edək ki, Pedaqoji Universitetin Quba filialı tədbirin əsas tərəfdaşlarından biridir.

*ADPU ilə TİKA arasında qarşılıqlı əməkdaşlıq məsələləri müzakirə olunub*

İyunun 23-də ADPU Türk Əməkdaşlıq və Koordinasiya Agentliyinin (TİKA) Bakı proqram kordinatoru Fatih Yılmaz və TİKA Bakı proqram kordinasiya ofisinin assistenti Elmir Laçınov ilə görüş keçirilmişdir.

Görüşdə rektor prof. C.Cəfərov ADPU-nun tarixi, fakültələri, filialları, universitetin 100 illik fəaliyyəti, Türkiyə Universitetləri ilə olan əlaqələri və Gazi Universiteti ilə həyata keçirəcəyi ikili diplom proqramı haqqında qısa məlumat verib.

Görüş zamanı TİKA-nın dəstəyi ilə Türkiyə universitetləri və ADPU arasında ikili diplom, Türkoloji Mərkəzin yaradılması ilə bağlı məsələlər müzakirə edildi. Sonda qonaqlar ADPU-nun "Türk Araşdırmaları" Elmi Tədqiqat Mərkəzini ziyarət ediblər.

*Frankofoniya Universitet Agentliyinin regional direktoru Mohamed Ketata ADPU-da olub*

İyunun 23-də ADPU Frankofoniya Universitet Agentliyinin Mərkəzi və



Şərqi Avropa üzrə regional direktoru Mohamed Ketata və Azərbaycan Dövlət Neft və Sənaye Universitetinin nəzdində Azərbaycan-Fransız Universitetinin (UFAZ) icraçı direktoru dosent Vazeh Əskərov ilə görüş keçirilmişdir.

Görüşdə ADPU-nu universitetin rektoru prof. C. Cəfərov, elm və innovasiyalar üzrə prorektor prof. A. Zamanov, tədris işləri üzrə prorektor dos. E. Aslanov, Xarici Dillər Mərkəzinin fransız dili müəllimləri S. Dadaşova, A. Cəfərova, A. Qocayeva, N. Mirzəyeva və Beynəlxalq əlaqələr şöbəsinin mütəxəssisi N.Mahmudova təmsil ediblər.

Görüşün təşkilinə görə təşəkkürünü bildirən V.Əskərov ADPU-nun müəllim və tələbələrini UFAZ-da Bakı Frankofoniya Məşğulluq Mərkəzinin açılışına dəvət etdi.

Sonda cənab M.Ketata ADPU-nu ziyarət etməkdən məmnunluğunu bildirərək, Frankofoniya Universitet Agentliyinin missiyası, fəaliyyəti və universitetlərlə əməkdaşlığı barədə məlumat verdi.

Görüş zamanı ADPU-nun Frankofoniya Universitet Agentliyinə üzv olacağı barədə razılıq əldə olundu.

*ADPU ilə Ted Universiteti arasında memorandum imzalanıb*

İyunun 28-də ADPU ilə Türkiyənin Ted Universitetinin nümayəndə heyəti ilə görüş keçirilib.

Görüşdə tərəflər təmsil etdikləri ali təhsil müəssisələri haqqında bir-birlərinə ətraflı məlumat verərək əməkdaşlıq imkanlarını müzakirə ediblər.

Yekunda rektorlar prof. Cəfər Cəfərov və prof. dr. İhsan Sabuncuoğlu universitetlər arasında qarşılıqlı əməkdaşlığa dair memorandum imzalayıblar.

*Özbəkistanın millət vəkili, filoloq, şair Gulbakhor Saydganieva ilə görüş*

İyunun 28-də Özbəkistanın millət vəkili, Özbəkistan Yazarlar Birliyinin üzvü, filoloq, şair Gulbakhor Saydganieva ADPU-nun qonağı olub.

Qonağı rektor prof. Cəfər Cəfərov, Beynəlxalq əlaqələr üzrə prorektor prof. Mahirə Hüseynova və Filologiya fakültəsinin nümayəndələri qarşılayıb.

Rektor prof. C. Cəfərov Gulbakhor Saydganievaya Azərbaycan-Özbəkistan ədəbi-mədəni əlaqələrinin yaradılmasında göstərdiyi xidmətə görə ADPU rəhbərliyi tərəfindən təltif olunduğu Fəxri Fərmanı təqdim edib.

*"İngilis dilinin tədrisində mükəmməllik" təlimi keçirilmişdir*

İyulun 1-də ADPU-da Şimali Karolina Dövlət Universitetinin (ŞKDU) nümayəndələri tərəfindən azərbaycanlı orta məktəb ingilis dili müəllimləri üçün nəzərdə tutulmuş "İngilis dilinin tədrisində mükəmməllik" təlimi keçirilmişdir. ŞKDU və onun yerli tərəfdaşı olan Pedaqoji Universitetin birgə təşkil etdiyi konfransın məqsədi tələbələrinin yüksək nəticələr əldə etməsinə kömək göstərmək üçün azərbaycanlı müəllimlərin tədrisin ən müasir və ünsiyyət əsaslı metodlarından istifadələrini təmin etməkdir. Tədbirdə ŞKDU-nun Qlobal Təlim Təşəbbüsü Proqramının mütəxəssisi Amanda Baker, ABŞ-nin Azərbaycandakı Səfirliyinin Mədəniyyət və Təhsil İşləri üzrə müşaviri Riçard Pinkham və səfirliyin təhsil üzrə mütəxəssisi Ramina Mürşüdova, elacə də ingilis dilini tədris edən orta məktəb, ADPU və digər ali təhsil müəssisələrinin müəllimləri iştirak edib.

ŞKDU-nun Xarici dillər və ədəbiyyat fakültəsinin ingilis dili ikinci dil kimi kafedrasının müdiri Jillian Heseler "Birbaşa qarşılıqlı əlaqə və əməkdaşlıq vasitəsilə aktiv öyrənmə", universitetin Proqram direktorunun köməkçisi Olqa Uzun "Nəzəriyyə və praktikada tənqidi düşüncə", TESOL sertifikatı təlimçisi və Qlobal Təlim İnstitutunun akademik direktoru Paula Wilder "Bacarıqların inkişafını təşviq etmək üçün effektiv dil qiymətləndirilməsi" mövzusunda tədqimatla çıxış ediblər.

*Çinli təqaüdçülərin doktorantura səviyyəsinə qəbulu ilə bağlı müsahibə keçirilib*

ADPU-da Hökumətlərarası Təqaüd Proqramı (HTP) çərçivəsində 2022/2023-cü tədris ilində doktorantura səviyyəsində təhsil almaq üçün namizədliyi təsdiq olunmuş Çin təqaüdçüləri ilə müsahibə keçirilib. Müsahibədə ADPU-nun rektoru professor Cəfər Cəfərov başda olmaqla prorektorlar, Əcnəbi tələbələrlə iş, Elmi-təşkilati şöbə, Magistratura və doktorantura şöbələrinin müdirləri və əməkdaşları iştirak ediblər.

Müsahibə nəticəində iki çinli təqaüdçünün HTP çərçivəsində ADPU-nun doktorantura səviyyəsində təhsil almasının məqsədəuyğunluğu haqqında qərar qəbul edilib.

*ADPU-nun iki nəfər tələbəsi Danimarkada təhsil almağa başlayıb*

ADPU 2016-cı ildən Danimarkanın Kopenhagen Universitet Kolleci (UCC) ilə Erasmus + proqramı çərçivəsində tələbə-müəllim mobilliyini həyata keçirir. Bu günə kimi həyata keçirilən mobillikdə ümumilikdə 19 müəllim və 13 tələbə iştirak etmişdir. ADPU-nun İbtidai təhsil fakültəsinin III kurs tələbəsi Mahyaddinova Əsbət və Kimya və biologiya fakültəsinin IV kurs tələbəsi Bəylərli Esfir Erasmus+ mübadilə proqramı çərçivəsində Danimarkanın Kopenhagen Universitet Kollecində (UCC) 2022-2023-cü tədris ilinin payız semestrinə başlayıblar.

*ADPU ilə Biləcik Şeyx Edebali Universiteti arasında qarşılıqlı əməkdaşlıq məsələləri müzakirə olunub*

Avqustun 30-da ADPU və Türkiyənin Biləcik Şeyx Edebali Universiteti arasında görüş keçirilib. Görüşdə Biləcik Şeyx Edebali Universitetinin rektoru prof. dr. Şükrü Bəydəmir, müşavir Özgür Özcan, Beynəlxalq əlaqələr üzrə koordinator Murat Ağırman, ADPU-da 1 illik Osmanlı tarixi keçən Qaziantep universitetinin müəllimi Sadık Çetin və Oxford Xaricdə Təhsil Məsləhətçiliyinin qurucu direktoru Kənan Kərimov iştirak ediblər.

Görüş zamanı ADPU-nu universitetin rektoru professor Cəfər Cəfərov, Tədris işləri üzrə prorektor Eldar Aslanov, Beynəlxalq əlaqələr şöbəsinin mütəxəssisləri Rəna Həsənova və Gülnar Ələkbərova təmsil ediblər. Görüşün yekununda rektorlar prof.dr. Cəfər Cəfərov və prof. dr. Şükrü Bəydəmir universitetlər arasında qarşılıqlı əməkdaşlığa dair memorandum imzalayıblar.

*UNİCEF nümayəndələri ilə müzakirə*

Sentyabrın 13-də ADPU-nun Tədris işləri üzrə prorektoru Eldar Aslanov, Beynəlxalq əlaqlər şöbəsinin müdiri Günay Məhərrəmova və universitet nümayəndələri ilə ilə UNİCEF-in beynəlxalq eksperti Alexandra Kortazar və təhsil üzrə mütəxəssisi Leyla Həsənova arasında görüş keçirilib.

Görüşdə pedaqoji proqramların hazırlanmasında istifadə olunan metodikalar, ənənəvi metodikalara müasir metodikaların inteqrasiyasının vacibliyi , kadrların hazırlanması istiqamətində intellektual və peşə hazırlığı səviyyəsinin yüksəldilməsi və təkmilləşdirilməsi, daim dəyişən və yeniləşən şəraitə uyğunlaşması kimi mövzulardan bəhs olundu. Daha sonra iştirakçılar məktəbədər təhsil proqramının və məktəbəqədər təhsil müəllimləri üçün keçirilən təlimlərin keyfiyyəti, təlimlərin zəif və güclü tərəfləri barədə müzakirələr apardılar.

*Əməkdaşlarımız Ruminiyada beynəlxalq həftədə iştirak ediblər*

19-23 sentyabr 2022-ci il tarixlərində Ruminiyanın Qalati şəhərində "Dunărea de Jos" Universitetində (UDJG) Beynəlxalq Əlaqələr Departamentinin Erasmus+ ofisi tərəfindən təşkil edilən Erasmus+ Beynəlxalq Həftəsinin ilk buraxılış tədbiri keçirilib. Tədbirdə ADPU-dan Xarici Dillər Mərkəzinin baş müəllimləri Muxtarova Simuzər və Babayeva Samirə iştirak ediblər.

Beynəlxalq həftənin əsas mövzusu həm ali təhsildə beynəlmiləlləşmə və rəqəmsallaşdırma strategiyalarını təşviq etmək və gücləndirmək, həm də universitetlərarası əməkdaşlıq əlaqələrini inkişaf etdirməkdir.

## PEDAQOJİ UNİVERSİTETDƏ FƏLSƏFƏ FƏNNİNDƏN DOKTORANTURAYA QƏBUL İMTAHANLARI KEÇİRİLİB



Sentyabrın 5-də ADPU-da fəlsəfə doktoru proqramı üzrə 2022-ci il üçün fəlsəfə fənnindən doktoranturaya qəbul imtahanları keçirilib. İmtahanlarda fəlsəfə doktorluğu proqramı üzrə ümumilikdə 9 ali təhsil müəssisəsinə qəbul olunmaq üçün müraciət etmiş və xarici dil imtahanından uğur qazanan 73 nəfər iddiaçı iştirak edib. Pedaqoji Universitetin rektoru prof. Cəfər Cəfərov imtahan iştirakçılarına uğur arzulayaraq imtahanların təşkili ilə bağlı 30 avqust 2022-ci il tarixində əmr imzalandığını və əmrə əsasən, qəbul aparılacaq hər bir ali məktəbdən bir nümayəndənin daxil olduğu imtahan komissiyasının təşkil edildiyini diqqətə çatdırıb.

İmtahan komissiyasının sədri, universitetin elm və innovasiyalar üzrə prorektoru prof. Asəf Zamanov bildirib ki, ADPU Azərbaycan Respublikasının Elm və Təhsil Nazirliyi tərəfindən Bakı şəhərində doktoranturaya fəlsəfə fənnindən qəbul imtahanlarını təşkil etmək hüququ verilən üç ali təhsil müəssisəsindən biridir.

## MÜƏLLİMLƏR ÜÇÜN STEAM TƏLİMLƏRİ KEÇİRİLİR



Sentyabrın 2-də ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektorluğunun nəzdindəki Təlim-tədris Mərkəzinin təşkilatçılığı ilə "STEAM fənninin tədrisi. STEAM layihələri və texnologiyaları" adlı ilk təlim keçirilib. Təlimdə ADPU-nun rektoru prof. Cəfər Cəfərov, tədris işləri üzrə prorektor dos. Eldar Aslanov, ADPU-nun STEAM Mərkəzinin rəhbəri dos. Arzu Daşdəmirov, Fizikanın tədrisi texnologiyası kafedrasının müdiri dos. Sevinc Cəlilova və STEAM Mərkəzinin əməkdaşları iştirak edib.

"STEAM və onun elmi-pedaqoji əsasları" mövzusunda baş tutan təlimi ADPU-nun Fizikanın tədrisi texnologiyası kafedrasının baş müəllimi Gülşən Musayeva aparıb. İştirakçılara STEAM anlayışı, dünyanın STEAM mənzərəsi və fəlsəfəsi, mobil əsaslı öyrənmə (MBL) , problemlə əsaslı öyrənmə (PrBL),, sorğu əsaslı təlim (IBL), STEAM əsaslı dərslərdə innovasiyalar və yeni texnologiyaların tətbiqi haqqında geniş məlumat verilib. Təlimdə ümumilikdə 34 nəfər olmaqla ali və orta təhsil müəssisələrində çalışan müəllimlər iştirak edib.

## ADPU ALİMLƏRİNİN NİZAMİŞÜNASLIQ TƏDQİQATLARI TÜRKİYƏDƏ



NİSAN / MAYIS / HAZİRAN 2022 BURSA TÜRK OCAĞI GAZETESİ 13

AZERBAYCAN DEVLET PEDAGOJİ ÜNİVERSİTESİ'NDE KİTAP SUNUMU GERÇEKLEŞTİRİLDİ

19 Mayıs 2022 tarihinde Azerbaycan Devlet Pedagoji Üniversitesi "Filolojik Dilbilim" odasında "Büyük Azerbaycan Mütefekkiri Nizami" kitabının sunumu gerçekleştirildi.

Sunuma ADPU Rektörü Prof. Cafar Cafarov, Azerbaycan Milli Bilimler Akademisi Folklor Enstitüsü Müdürü, akademisyen Muhtar İmanov, AMEA Nesimi Dilbilim Enstitüsü Terminoloji Bölüm Başkanı ve Terminoloji Komisyonu Başkan Yardımcısı filoloji bilimleri doktoru, Prof. S.Sadıgova, şair, edebiyat bilimci Prof. Vüqar Ahmad, Prof Dr. Nizami Tağısoy, ADPU yapı başkanları, Filoloji fakültesi Profesör öğretim kadrosu ve öğrenciler katıldı.

Uluslararası İlişkiler üzere Rektör yardımcısı, Filoloji Fakültesi Dekanı Profesör Mahira Hüseynova açılış konuşması yaptı. Daha sonra ADPU Rektörü Profesör Cafar Cafarov kitapla ilgili konuşma yaptı.

Prof. Cafar Cafarov

Kitabın yazarları - Uluslararası İlişkiler üzere rektör yardımcısı, Filoloji Fakültesi Dekanı Profesör Mahira Hüseynova, ADPU Türk araştırmaları bölüm başkanı Profesör Elman Guliyev ve AMEA'nın "Dede Korkud" bölüm başkanı Profesör Seyfaddin Rzasoy kitapın yazılması ve değerleri hakkında bilgilendirme konuşmaları yaptılar.

Akademisyen Muhtar İmanov, profesör Sayali Sadıgova, edebiyat bilimci Prof. Vüqar Ahmad, Prof. Nizami Tağısoy ve beraberindekiler "Büyük Azerbaycan Mütəfəkkiri Nizami" kitabının öneminden bahsettiler. Konuşmacılar kitapın Azerbaycan Cumhuriyeti Cumhurbaşkanı Sayın İlham Aliyev'in "Nizami Yılı" yla ilgili kararına uygun yazıldığını beyan etdiler ve bu vesile ile kitap yazarların "Nizami yılı" emrinden doğan görevlerini yerine yetirmekle vatandaş ve bilim insanı olarak misyonlarının yerine yetirilmesinin bariz bir örneği olarak değerlendirildi.

Konuşmacılar, kitabın seçkin yayınlanmasının yanı sıra bilimsel detaylarını ele alarak "Nizami Yılı" na katkı olduğunu özellikle vurguladılar.

ADPU-nun beynəlxalq əlaqələr üzr prorektoru, Filologiya fakültəsinin dekanı prof.Mahirə Hüseynova, ADPU-nun Türk araşdırmaları bölməsinin rəhbəri prof. Elman Quliyev və AMEA Folklor İnstitutunun şöbə müdiri prof. Seyfəddin Rzasoyun hazırladıqları "Böyük Azərbaycan mütəfəkkiri Nizami" kitabı haqqında Türk Ocaqları Dərnəyi Bursa Şöbəsinin qəzetində məqalələr dərc edilib. Məqalədə vurğulanır ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin "Nizami ili" ilə bağlı Sərəncamına əsasən hazırlanan kitab Türk Ocaqları Dərnəyi Bursa şöbəsi tərəfindən nəşr edilib və bu Azərbaycan və ADPU alimlərinin nizamişünaslıq araşdırmalarının qardaş ölkədə geniş yayılması baxımından böyük əhəmiyyət daşıyır. Həmçinin, qəzetdə ADPU-nun Filologiya fakültəsinin müəllimi, fil.ü.f.d. Ülkər Baxşıyevanın kitabla bağlı yazısı da yer alıb.

Bu ilin may ayında Pedaqoji Universitetdə dərnəyin nəşr etdiyi "Böyük Azərbaycan mütəfəkkiri Nizami" kitabının təqdimat mərasimi keçirilib. Qeyd edək ki, Türk Ocaqları Dərnəyi 1912-ci ildən qardaş Türkiyədə fəaliyyət göstərən türk mədəniyyət mərkəzidir.

## PEDAQOJİ UNİVERSİTETDƏ ÖLKƏMİZDƏ İLK DƏFƏ VAHİD İNSTİTUSİONAL QİYMƏTLƏNDİRMƏ APARILIB

İyulun 8-də ADPU-nun Elmi Şurasının iclası keçirilib. İclasın əvvəlində rektor prof. Cəfər Cəfərov universitetin alimləri Şəhla Əliyeva və Əli Zalova professor elmi adını təsdiq edən attestatlarını təqdim edib, həmçinin tədrisdə və ictimai həyatda fərqlənən tələbələri təşəkkürnamə və fəxri fərmanla təltif edib. İclasda 2021-ci il üçün ADPU-da İnstitusional Qiymətləndirmənin nəticələri haqqında hesabatla çıxış edən Keyfiyyətin təminatı şöbəsinin müdiri dos. Qalib Şərifov ölkəmizdə ilk dəfə olaraq ADPU-da 38 keyfiyyət göstərici üzrə vahid sistem əsasında filial, kollec, fakültələr və Sabah qruplarının institusional qiymətləndirilməsinin aparıldığını qeyd edib.



Cari təqvim ilindən başlayaraq hər ilin 1-20 aprel tarixləri arasında həyata keçirilən institusional qiymətləndirmənin məqsədi universitetin müxtəlif strukturlarının müqayisəli inkişaf dinamikasını və əsas inkişaf istiqamətlərini, qarşıda duran vəzifələri müəyyənləşdirməkdir. Şöbə müdiri həmçinin yeni tədris ilindən etibarən əməkdaşların reytinq qiymətləndirmə meyarlarında aparılacaq təkmilləşdirmələr haqqında məlumat verib.

Tədris işləri üzrə prorektor dos. Eldar Aslanov 2021/2022-ci tədris ili üzrə bakalavrların yaz imtahan sessiyasının yekunları barədə məruzə ilə çıxış edərək bildirib ki, imtahanlar əsasən 01 iyun - 01 iyul 2022-ci il tarixlərində tərtib olunmuş cədvəl üzrə keçirilmişdir və 2021/2022-ci tədris ilinin yaz semestrinin imtahanlarda bakalavriat səviyyəsində təhsil alan tələbələrdən 8176 nəfər iştirak etmişdir. İmtahanlar yazılı, şifahi və hibrid formada təşkil olunmuşdur. İmtahan sessiyası dövründə Apelyasiya Komissiyasına 2434 ərizə daxil olmuşdur ki, onlardan 61 faizində nəticələr olduğu kimi saxlanılmış, 30 faizi isə müsbət həll edilmişdir. İmtahan qaydalarını pozduğuna görə 111 nəfər tələbənin imtahan işi ləğv olmuşdur. Prorektor qeyd edib ki, semestrin imtahan sessiyasının yekunlarına əsasən universitet üzrə tələbələrin müvəffəqiyyət və keyfiyyət göstəriciləri ötən ilin analoji sessiyası ilə müqayisədə bir qədər azalaraq 85 % və 53 % təşkil etmişdir ki, bu da yenidən əyani imtahanlara keçidlə bağlı təbii dalğalanmadır. Bunun əksinə buraxılış yekun dövlət attestasiyasında tələbələr buraxılış işləri üzrə 99,8 %, dövlət imtahanları üzrə isə 91 % müvəffəqiyyət əldə etmişlər. Dos. E.Aslanov yekunda bildirib ki, Pedaqoji Universitet tədrisin keyfiyyətinin artırılması tədbirlərində cari ilin mart-aprel aylarında ADPU-da bütün fakültə, filiallar və kollec üzrə tələbə və magistrantlar arasında tədris, öyrənmə mühiti, təchizat, gözləntilər və digər istiqamətlər üzrə 8964 təhsilalanın iştirakı ilə keçirilən meqasorğunun nəticələri də nəzərə alınacaqdır.

Şurada elm və innovasiyalar üzrə prorektor prof. Asəf Zamanov 2021/2022-ci tədris ili üzrə magistrlərin dissertasiya işlərinin müdafiəsi və yaz imtahan sessiyasının yekunları barədə məruzə ilə çıxış edərək vurğulamışdır ki, 296 magistrant imtahan sessiyasında iştirak etmişdir ki, onların müvəffəqiyyət və keyfiyyət göstəriciləri müvafiq olaraq 97,9 % və 81,37 % təşkil edir. Sonda rektor prof. C.Cəfərov tədqiqat universitetinə çevirilmək üçün vahid plan üzrə irəliləməyin önəmini qeyd edib.

## ADPU-DA NÖVBƏTİ İLK



İyulun 1-də Pedaqoji Universitetdə ibtidai sinif müəllimliyi ixtisası üzrə tədrisi ingilis dilində təşkil edilən ilk qrupun müdafiəsi keçirilib. Dövlət imtahanında Azərbaycan Respublikasının təhsil naziri Emin Əmrullayev şəxsən iştirak edib.

Sayca 14 nəfərdən ibarət olan eksperimantal qrupun məzunları rektor Cəfər Cəfərov və İbtidai təhsil fakültəsinin dekanı Fərrux Rüstəmovun rəhbərlik etdiyi böyük bir komissiya qarşısında təqdimatla çıxış ediblər. Onu da bildirək ki, eksperimental qrupun tələbələri 330 nəfərin içərisindən seçiliblər və dörd il boyunca ixtisaslarını ingilis dilində öyrəniblər.

Uğurlu müdafiədən sonra təəssüratlarını bölüşən nazir Emin Əmrullayev tələbələrin bu səviyyədə yetişməsində rolu olan müəllimlərə, dekanlığa təşəkkürünü bildirib. Tələbələrin peşə seçiminin də uğurlu olduğunu deyən təhsil naziri onlara dəstəyin bundan sonra da davam edəcəyini vurğulayıb. Təhsilini xaricdə davam etdirmək istəyənlərə isə xaricdə təhsil üzrə dövlət proqramlarına baş vurmağı tövsiyə edib.

Qeyd edək ki, ADPU-da müxtəlif ixtisaslar üzrə ingilisdilli qrupların açılması sistemli xarakter alıb. Əvvəlcə eksperimental qruplarda sınaqdan çıxdıqdan sonra müvafiq ixitsasların ingilis bölməsi üzrə ümumi qəbul elan olunur.

## MƏZUN GÜNÜ – 2022



İyunun 29-da ADPU-da məzun günü keçirildi. İlk öncə universitet rəhbərliyi Ulu öndər Heydər Əliyevin büstünü ziyarət edib, önünə gül dəstələri qoydular.

Tədbirdə universitetin rektoru prof. Cəfər Cəfərov, Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqının (ATGTİ) baş katibi Orduxan Qəhrəmanzadə, Səbail rayon Gənclər və idman idarəsinin rəisi vəzifəsinin icra edən Elnarə Əliyeva, Nəsimi rayon Gənclər və idman idarəsinin rəisi Şahmar Tağızadə, universitetin prorektorları, dekanları, digər rəhbər şəxsləri, tələbələr və valideynlər iştirak etdi. Məzun günü Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi ilə başladı, daha sonra şəhidlərimizin müqəddəs xatirəsi bir dəqiqəlik sükutla yad edildi.

Açılış nitqi söyləyən rektor C. Cəfərov məzunlara gələcək həyatlarında uğurlar arzuladı. Müzəffər Ali Baş Komandanın və şanlı ordunun zəfərlərindən danışan rektor Vətən müharibəsində iştirak edən 200-dən çox məzunumuzun və 13 şəhidimizin olduğunu bildirdi. Tələbələrə müəllim sənətinin şərəfli peşə olduğunu və ulu öndər Heydər Əliyevin "Mən yer üzündə müəllimdən yüksək ad tanımıram!" sözlərinin məzunlarımızın həyat yollarında daima mayak rolu oynadığını qeyd etdi.

Rektor bir daha tələbələrə gələcək müəllimlik həyatında uğurlar arzuladı və onların hazırlamasında pay sahibi olan müəllimlərə təşəkkürünü bildirib nitqini "Müqəddəs olan müəllim peşəsinə yiyələnən tələbələrin yolunun ADPU-dan keçdiyinə və bizim də bunda pay sahibi olduğumuza görə qürur duyuruq..." sözləri ilə bitirdi. Tədbirdə universiteti yüksək ümumi ortalama müvəffəqiyyət göstəricisi (ÜOMG) ilə bitirən və təhsil aldığı müddətdə universitetin sosial-ictimai həyatında fəal olan bir qrup tələbə rektorun əmri ilə "Fəxri Fərman"la təltif edildi.

Daha sonra tədbir məhşur simaların ifasında konsert proqramı ilə davam etdi.

## "ALQORİTMİKA - RƏQƏMSAL BACARIQLARIN İNKİŞAFI" LAYİHƏSİNİN MƏZUNLARI TƏLTİF EDİLİB



İyunun 29-da ADPU-da Azərbaycan Respublikası Təhsil Nazirliyi və "Alqoritmika" şirkətinin birgə əməkdaşlığı çərçivəsində ADPU tələbələri üçün həyata keçirilən "Alqoritmika – rəqəmsal bacarıqların inkişafı" layihəsinin yekunlarına həsr olunmuş tədbir keçirilib. Tədbirdə Azərbaycan Respublikasının təhsil naziri Emin Əmrullayev, ADPU-nun rektoru prof. Cəfər Cəfərov, "Alqoritmika" şirkətinin nümayəndəsi Qəmər Məmmədova, digər qonaqlar, universitetin professor-müəllim heyəti və layihəyə qatılan tələbələr iştirak ediblər. Rektor C.Cəfərov qeyd edib ki, dövrün çağırışlarına adekvat olaraq ADPU-nun xüsusilə Riyaziyyat fakültəsinin kompüter elmləri sahəsində fəaliyyəti mövcud bazar iqtisadiyyatının tələblərinə uyğunlaşdırılır. Təhsil Nazirliyinin təşəbbüsü ilə "Alqoritmika" İT kurslarının keçirdiyi "CODE FOR FUTURE" təhsil layihəsinin də belə addımlardan olduğunu vurğulayan rektor bildirib ki, 2021-2022-ci tədris ilində Riyaziyyat-İnformatika müəllimliyi və İnformatika müəllimliyi ixtisası üçün ilk dəfə məhz Pedaqoji Universitetdə keçirilən təhsil layihəsində 160 nəfər tələbə iştirak edib. Layihə çərçivəsində universitetdə ən son kompüterlər ilə təchiz olunmuş 5 yeni laboratoriya qurulmuşdur.

Cari ilin 15 fevral-31 may tarixləri aralığında davam edən layihə fərdi təlim, nəzəriyyə və tətbiqi yanaşma, fənlərarası əlaqə və motivasiyanın artırılması prinsiplərinə əsaslanaraq təhsilalanlara yeni texnologiya və rəqəmsal bacarıqları təcrübədə öyrənməyə, proqramlaşdırmanın sirlərinə bələd olmağa imkan verir. Prof. C.Cəfərov deyib ki, layihənin ADPU-nun filiallarında da keçirilməsi, həmçinin məzmunun tədris planına daxil edilməsi və yaxın gələcəkdə Universitetin müəllimləri üçün də peşəkarlığın artırılması təlimlərinin təşkili nəzərdə tutulur. Tədbirdə çıxış edən təhsil naziri Emin Əmrullayev layihədən məzun olan tələbələri təbrik edərək, rəqəmsal bacarıqların müasir dünyadakı roluna diqqət çəkib.

Nazir ADPU-nun ölkəmizin ixtisaslaşmış əsas müəllim hazırlığı mərkəzi olduğunu və buna görə də məhz Dövlət Pedaqoji Universitetində bu cür ən yeni yanaşmaların tətbiqi, yeni nəsil müəllim kadrlarının hazırlanması istiqamətində həyata keçirilən tədbirlərin strateji önəmini vurğulayıb.

Sonda təlimlərin yekunun nəticələrinə görə ən yüksək nailiyyət göstərmiş üç tələbə, – P. Bayramova, X. Əlili və V. Cəfərlinin təqdimatları keçirilib və layihədən məzun olan tələbələrə sertifikatlar təqdim olunub.

## ADPU-DA KEÇİRİLƏN "İLİN GƏNC ALİMİ VƏ TƏDQİQATÇISI" MÜSABİQƏSİNİN QALİBLƏRİ BƏLLİ OLUB



İyunun 21-də ADPU-da 27 Mart - Elm Günü münasibəti ilə elan olunmuş "İlin gənc alimi və tədqiqatçısı" müsabiqəsinin qaliblərinin mükafatlandırılması mərasimi keçirilib.

Mərasimdə çıxış edən ADPU-nun rektoru professor Cəfər Cəfərov qalibləri təbrik edərək, bildirib ki, gənc alimlərin stimullaşdırılması Pedaqoji Universitetin strateji inkişaf planında qarşıya qoyulan hədəflərə çatmaq üçün tətbiq olunan vasitələrdən biridir və bu tədbirlər gələcəkdə daha da böyük kontingenti əhatə edəcəkdir. Universitetin elm və innovasiyalar üzrə prorektoru, müsabiqəni təşkil edən Elm komissiyasının sədri professor Asəf Zamanov isə öz növbəsində qeyd edib ki, müsabiqəyə ADPU və filiallardan ümumilikdə 13 gənc tədqiqatçı müraciət edib. Humanitar elmlər üzrə I yerə İlkin Əsgərov və Sevinc Quliyeva, II yerə Taleh Cəfərov layiq görülüb, III yerə çıxan isə olmayıb. Dəqiq və təbiət elmləri nominasiyası üzrə isə birinci yeri tutan olmayıb. Nominasiya üzrə Gülnar Əlizadə II yerə, Ülkər Baxşıyeva isə III yerə layiq görülüblər. Müsabiqənin qaliblərinə pul mükafatı və müvafiq diplomlar təqdim olunub.

## "MƏKTƏB LİDERLİYİ PROQRAMI"NIN AÇILIŞ MƏRASİMİ KEÇİRİLİB

ADPU-nun Strateji İnkişaf Mərkəzi Azərbaycan Respublikasının Elm və Təhsil Nazirliyi ilə birgə gələcəkdə dövlət ümumtəhsil müəssisələrində direktor vəzifəsində çalışmaq arzusunda olan pedaqoji kadrlar üçün "Məktəb liderliyi proqramı"nı icra edir. Cari ilin aprel-may ayları ərzində proqrama sənəd qəbulu aparılıb və seçim imtahanları keçirilib.



Açılış mərasimində çıxış edən ADPU-nun rektoru professor Cəfər Cəfərov ADPU-da müəllim hazırlığı istiqamətində yeni yanaşmalardan danışıb və təhsil sahəsində yeni nəsil liderlərin yetişdirilməsi məqsədi ilə universitetdə bir sıra proqramların icra olduğunu, yaxın zamanlarda ABŞ-ın Corc Vaşinqton Universiteti ilə "Təhsil siyasəti və idarəetmə" ixtisası üzrə ikili diplom magistr proqramının ilk buraxılışının keçiriləyini diqqətə çatdırıb.

Təhsil Nazirliyinin Ümumi təhsilin təşkili və idarəolunması şöbəsinin müdiri Elnur Əliyev qeyd edib ki, məktəblərdə müasir təfəkkürlü və səriştəli idarəçilərin və müəllimlərin yetişdirilməsi nazirliyin əsas hədəflərindəndir və bu istiqamətdə Pedaqoji Universitet geniş imkanlara malikdir.

ADPU-nun strateji inkişaf məsələləri üzrə prorektoru, proqram rəhbəri Könül Pirverdiyeva "Məktəb liderliyi proqramı" haqqında təqdimat edərək bildirib ki, proqramın məqsədi məktəb performansını yüksəltmək və şagird nailiyyətlərini artırmaq məqsədilə nəzəri və təcrübi öyrənmə imkanları təmin edərək müasir çağırışlara cavab verən təhsil liderlərinin (idarəedicilərin) hazırlanmasıdır. İlkin sənəd qəbuluna müraciət edən 1006 nəfərdən 418 nəfəri test imtahanında iştirak etmişdir. Növbəti mərhələyə keçən 141 nəfərdən yekunda direktor, direktor müavinləri, müəllimlər, habelə psixoloqların yer aldığı 50 nəfər proqramın əsas mərhələsinə seçiliblər. Proqram çərçivəsində seçilmiş 50 nəfərə Türkiyənin və Azərbaycanın tanınmış mütəxəssisləri tərəfindən məktəbin idarə olunması və liderlik, tədrisin təşkili və idarə edilməsi, təhsildə qiymətləndirmə və monitorinq, məktəbdə heyətin idarə edilməsi və məktəbdə səmərəli ünsiyyətin, sağlam psixoloji mühitin təşkili və idarə edilməsi modulları üzrə 145 saatlıq təlim kursu keçirilir.

Qeyd edək ki, proqramın davamlı olaraq fəaliyyət göstərəcək.

## CORC VAŞİNQTON UNİVERSİTETİ İLƏ BİRGƏ İKİLİ DİPLOM PROQRAMININ İLK MƏZUN BURAXILIŞI




İyunun 13-də Bakı Konqres Mərkəzində ADPU-nun ABŞ-nin Corc Vaşinqton Universiteti (CVU) ilə birgə "Təhsil siyasəti və idarəetməsi" ixtisası üzrə ikili diplom magistr proqramının ilk buraxılışına həsr olunmuş məzun günü mərasimi keçirilib.

Proqram Azərbaycan Respublikası Prezidentinin 16 noyabr 2018-ci il tarixli Sərəncamı ilə təsdiqlənmiş "2019-2023-cü illər üçün Azərbaycan Respublikasında ali təhsil sisteminin beynəlxalq rəqabətliliyinin artırılması üzrə Dövlət Proqramı" çərçivəsində 31 yanvar 2020-ci ildə ADPU və CVU arasında imzalanan əməkdaşlıq müqaviləsinə əsasən həyata keçirilir.

Tədbirdə dövlət rəsmiləri, millət vəkilləri, diplomatik korpusun, özəl sektor və QHT-lərin nümayəndələri, ali və orta ixtisas təhsili müəssisələrinin rəhbərləri, ADPU-nun rəhbərliyi və professor-müəllim heyəti, Corc Vaşinqton Universitetinin nümayəndələri, proqramın məzunları və onların ailə üzvləri iştirak ediblər. CVU-nun proqram direktoru Sevinc Məmmədovanın moderatorluğu ilə keçirilən mərasimdə çıxış edən ADPU-nun rektoru prof. Cəfər Cəfərov qeyd edib ki, dövlət proqramına əsasən xarici ali təhsil müəssisələri ilə imzalanan ikili diplom proqramlarının ilki məhz ADPU və CVU arasında reallaşan proqramdır. Hazırda proqram üzrə iki kursda 50 nəfər tam ödənişsiz təhsil alır. Bu ildən etibarən proqrama qəbul planı 25 yerdən 40 yerə qaldırılıb. Dərslər ingilis dilində aparılır. Rektor bildirib ki, ilk ildə proqrama qəbul olunan 24 nəfərdən 22 nəfər magistrant bu gün uğurla məzun olurlar və onlar Azərbaycanda ilk dəfə ADPU-nun magistr diplomu ilə yanaşı CVU-nun "Təhsil siyasəti və idarəetməsi" ixtisası üzrə magistr dərəcəsi də alırlar. Rektor proqramın ərsəyə gəlməsindəki dəstəyinə görə Azərbaycan Respublikasının Təhsil Nazirliyinə, Azərbaycan Respublikasının Dövlət Neft Fonduna, Dövlət Proqramının işçi qrupuna, İkili Diplom Proqramının müəllim və idarə heyətinə təşəkkürünü bildirib, ilk məzunları təbrik edib.

Mərasimdə çıxış edən Azərbaycan Respublikasının təhsil naziri Emin Əmrullayev bildirib ki, bugünkü buraxılış mərasimi özünün tarixi əhəmiyyəti ilə seçilir. Çünki bu proqram Azərbaycan dövləti və hökumətinin təhsilin inkişafı ilə bağlı gördüyü işlərin bir göstəricisidir. Azərbaycan cəmiyyəti, iqtisadiyyatı üçün ixtisaslı mütəxəssislərin hazırlanması məqsədi ilə həyata keçirilən bu və bu kimi proqramların təsirləri gələcəkdə milli təhsil sektorumuzun inkişafında və minlərlə insanların həyatında özünü göstərəcək.

CVU-nun Təhsil və İnsan İnkişafı Məktəbinin professoru Kolin Qrin uğurlu əməkdaşlıqdan məmnunluq ifadə edərək məzunları təbrik edib. CVU-nun Təhsil və İnsan İnkişafı Məktəbinin dekanı dr. Maykl Fayer isə videomüraciət formatında öz təbriklərini tədbir iştirakçıları ilə bölüşüb.

Mərasimin yekununda məzunlara fəxri diplomlarını təqdim ediblər. Məzun günündən sonra təhsil naziri Emin Əmrullayev tərəfindən "2019-2023-cü illər üçün Azərbaycan Respublikasında ali təhsil sisteminin beynəlxalq rəqabətliliyinin artırılması üzrə Dövlət Proqramı" çərçivəsində ADPU və CVU arasında ikili diplom proqramına verdiyi töhfələrə görə rektor prof. C. Cəfərov, CVU-nun Təhsil və İnsan İnkişafı Məktəbinin professoru K.Qrin və ikili diplom proqramının CVU tərəfindən proqram direktoru S. Məmmədova Azərbaycan Respublikasının Təhsil Nazirliyinin təşəkkürnaməsi ilə təltif ediliblər.

## PEDAQOJİ UNİVERSİTET YÜKSƏK NAİLİYYƏTLİ GƏNCLƏRİN SEÇİMİNƏ ÇEVİRİLİB



Pedaqoji Universitet özünün sürətli inkişafı və yenilənməsi dövrünü yaşayır. Effektiv tədbirlərin nəticəsində 100 illik ali təhsil ocağının təlim-tədris mühitində xeyli yeniliklərə imza atılmış, kəmiyyət və keyfiyyət göstəricilərinin davamlı müsbət dinamikasına nail olunmuşdur. Təsadüfi deyil ki, cari ildə ali təhsil müəssisələrinə qəbul imtahanlarında ADPU-nun təxminən 2500 nəfərlik plan yeri 100 faiz dolmuşdur və universiteti seçən yüksək ballı tələbələrin sayı yüksəlmişdir.

Qeyd olunanlarla yanaşı, ADPU-nun bütün fakültələrinə qəbul olunan tələbələr arasında müxtəlif sahələrdə nailiyyətlərə imza atmış gənclərimiz də az deyil. Universitetin Fizika fakültəsinin texnologiya müəllimliyi ixtisası da bu sırada özünəməxsus yer tutur. Sentyabrın 22-də belə gənclərin bir qismi ilə ali təhsil ocağının rəhbərliyi görüş keçirib. Görüşdə rektor prof. Cəfər Cəfərov, tədris işləri üzrə prorektor dos. Eldar Aslanov, sosial və humanitar məsələlər üzrə prorektor prof. Fikrət Rzayev, Fizika fakültəsinin dekanı dos. Arzu Daşdəmirov və tələbələr iştirak edib.

2022-2023-cü tədris ilində rus bölməsi üzrə ADPU-nun texnologiya müəllimliyi ixtisasına qəbul olunmuş Aysel Aslanzadə bədii gimnastika və riyaziyyat üzrə ölkə və beynəlxalq miqyaslı xeyli uğurlara imza atıb. Bu ixtisası seçən digər tələbə Sahib Hüseynzadənin isə müxtəlif idman sahələrində Respublika və beynəlxalq səviyyədə nailiyyətləri var. Həmçinin, bu tələbələrin arasında Vətən müharibəsində iştirak edərək müxtəlif təltiflərə layiq görülmüş Turan Məmmədov da yer alır.

Tələbələrlə görüşdə onların fəaliyyəti yüksək qiymətləndirilmiş, gənclərimizin hər sahədə uğurlu mövqe tutduğu qeyd olunmuşdur. Xüsusən, istedadlı və bacarıqlı gənclərimizin müəllimlik peşəsinə yönəlməsinin olduqca sevindirici olduğu vurğulanmışdır. Tələbələrə universitetin atributları hədiyyə edilmiş, xatirə fotosu çəkdirilmişdir.

Tiraj - 500
Şəhadətnamə - № 191

# GƏNC MÜƏLLİM QƏZETİ

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ

## PEDAQOJİ UNİVERSİTET GƏNCLƏRİ VƏTƏN VƏ İNFORMASİYA MÜHARİBƏSİNDƏ

44 günlük Vətən müharibəsi Azərbaycanın şanlı tarixidir. Azərbaycanın Silahlı Qüvvələri 2 il öncə sentyabrın 27-dən noyabrın 10-dək davam edən müharibədə Müzəffər Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi ilə bütün döyüş əməliyyatlarını yüksək səviyyədə həyata keçirərək mənfur düşməni diz çökdürdü, şanlı zəfər qazandı və tarixi ədaləti, ölkəmizin ərazi bütövlüyünü bərpa etdi. Ötən hər gün bizi vətən müharibəsindən zaman etibarilə uzaqlaşdırsa da, hərbçilərimizin şücaəti, canı və qanı bahasına qazanılan bu qələbə hər bir azərbaycanlı üçün son dərəcə əziz və qiymətlidir. Biz düz 30 il ərzində torpaqlarımızın işğaldan azad ediləcəyinin ümidi ilə yaşamışdıq və qələbə müjdəsini gözləmişdik. Arzularımız 44 günlük Vətən müharibəsində çin oldu və biz böyük qələbənin sevincini yaşadıq. Azərbaycan Dövlət Pedaqoji Universitetinin 13 tələbə və məzunu da 44 günlük Vətən müharibəsində öz qanları ilə tarixi zəfərə imza atmış şəhid yetirmələrimizdir: Ərəstə Baxışova, Firdovsi Tahirov, Orxan Nəbiyev, Elgün Əzizov, Rəvan Lətifov, Ceyhun Nüsrətli, Qoşqar Ömərov, Ağaqardaş Abbasov, İlkin Ağaquliyev, Etiram Hüseynli, Cilingir Nəbiyev, Elvin Zakirov, Əli Ələsov. Bunlardan Firdovsi Tahirov, və Orxan Nəbiyev "Azərbaycan bayrağı" ordeni ilə təltif olunmuş igid qəhrəmanlarımızdandır. 2021-ci ildə Universitetin Tələbələrlə iş və ictimaiyyətlə əlaqələr şöbəsinin təşəbbüsü ilə şəhidlər haqqında Vikipediyada məqalələr hazırlanmış, həmçinin müxtəlif illərdə ADPU-da təhsil alan və II Dünya müharibəsi, I Qarabağ müharibəsi, Aprel döyüşləri və Vətən müharibəsində şəhid və ya qazi olan, xüsusi qəhrəmanlıq göstərən tələbə-məzunlarımızın xatirəsinə həsr olunmuş "Pedaqoji Universitetin Qəhrəmanları" kitabı hazırlanaraq işıq üzü görmüşdür. Kitab qazilərə və şəhidlərin ailələrinə, müxtəlif dövlət və ictimai qurumlara, kitabxanalara hədiyyə edilmişdir.




Vətən müharibəsi günlərində gənclərimizin əksəriyyəti kimi, ADPU-nun tələbələri də öz xüsusi aktivlikləri ilə fərqlənmiş, arxa cəbhədə informasiya müharibəsinin bilavasitə iştirakçısı olmuşlar. Sosial şəbəkələr üzərindən düşmənin təbliğat kampaniyalarına zamanında və layiqli cavablar verilmişdir. Bütün bu proseslərin təşkilində Azərbaycan Dövlət Pedaqoji Universitetində fəaliyyət göstərən formal və qeyri-formal ictimai birliklər, o cümlədən universitetin tələbə təşkilatları xüsusilə fərqlənmişlər. Hələ Vətən müharibəsi başlamazdan əvvəl 2020-ci ilin iyul ayında Tovuz döyüşləri ərəfəsində ADPU rəhbərliyinin dəstəyi, Tələbələrlə iş və ictimaiyyətlə əlaqələr şöbəsinin və tələbə təşkilatlarının təşəbbüsü ilə universitetin fəal tələbələrindən ibarət "ADPU İNFO VAR TEAM" adlı könüllü işçi qrup fəaliyyət göstərməyə başlamışdır. Könüllü işçi qrup öz koordinasiyalı fəaliyyət sistemi ilə mütəmadi olaraq müxtəlif sosial şəbəkələr vasitəsilə (xüsusilə Tvitter) Azərbaycan həqiqətlərinin və Ermənistan hərbi-siyasi rəhbərliyinin beynəlxalq hüququn norma və prinsiplərini kobud şəkildə pozmasının dünya ictimaiyyətinə çatdırılmasına səy göstərmişdir. Eyni zamanda Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin və bir çox dövlət orqanlarının paylaşımlarına istinad edərək düşmən mediasının saxta məlumatlarının yayılmasının qarşısı alınmışdır. Bu və digər gənclər komandalarının fəaliyyəti nəticəsində Azərbaycan həqiqətləri ilə bağlı paylaşımlar dəfələrlə dünya və ölkə trendlərinə çıxmışdır.

Vətən müharibəsi başa çatdıqdan sonra da şəhid ailələri və qazilərimiz ali təhsil müəssisəsinin rəhbərliyinin xüsusi diqqəti ilə əhatə olunmuşdur. Ötən 2 il ərzində ADPU-nun rektoru professor Cəfər Cəfərov universitetin bir sıra Vətən müharibəsi qaziləri və müharibə iştirakçıları ilə görüşmüşdür. Tələbələrlə iş və ictimaiyyətlə əlaqələr şöbəsinin əməkdaşları tərəfindən şəhid-məzun Ağaqardaş Abbasovun ailəsi, Məzun-koordinasiya bölməsi və Kimya və biologiya fakültəsinin nümayəndələri tərəfindən şəhid-məzunlar Firdovsi Tahirov və Ceyhun Nüsrətlinin məzarı, ADPU və ADPU-nun Şamaxı filialının Gənclər Birliklərinin nümayəndələri tərəfindən şəhid-məzun Orxan Nəbiyevin ailəsi, ADPU TGT-nin nümayəndələri tərəfindən şəhid-məzun Ərəstə Baxışovanın ailəsi ziyarət olunmuşdur. Tələbələrlə iş və ictimaiyyətlə əlaqələr şöbəsinin təşəbbüsü ilə universitet daxilində quraşdırılmış interaktiv monitorlarda I Qarabağ müharibəsi və Vətən müharibəsində şəhid olan qəhrəmanların fotoları nümayiş olunmuşdur. Filologiya fakültəsinin foyesində silsilə tədbirlərin davamı olaraq Vətən müharibəsindəki tarixi qələbəmizi özündə əks etdirən möhtəşəm "Zəfər Günü" stendi yaradılmış, ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecində II Qarabağ müharibəsində şəhid olmuş məzunların xatirəsini əbədiləşdirmək məqsədi ilə "Qəhrəmanlıq Zirvəsi" auditoriyası açılmış, İncəsənət və fiziki tərbiyə fakültəsində "Şuşa İli" çərçivəsində 44 günlük Vətən müharibəsinə həsr edilmiş qorelyefin açılışı olmuşdur. Qorelyefin müəllifi Təsviri incəsənət müəllimliyi ixtisası üzrə III kurs tələbəsi Pərviz Məhmudovdur. Ümumilikdə Azərbaycan Dövlət Pedaqoji Universitetində 2021-ci ildə 27 Sentyabr – Anım Günü və 8 Noyabr – Zəfər Günü ilə bağlı 44 gün ərzində 50-ə yaxın tədbir, görüş, müsabiqə və dəyirmi masalar həyata keçirilmişdir.

Mənfur düşmən öz acınacaqlı məğlubiyyətindən dərs almayaraq revanşist siyasətini davam etdirməkdən hələ də əl çəkmiş deyil. Son olaraq bu ilin sentyabrın ayının 12-də gecə saatlarında Ermənistan Silahlı Qüvvələri Azərbaycan-Ermənistan dövlət sərhədinin Daşkəsən, Kəlbəcər və Laçın istiqamətlərində genişmiqyaslı təxribatlar törədiblər. Şübhəsiz ki, bütün bu təxribatlara rəşadətli Azərbaycan Ordusu tərəfindən müvəffəqiyyətlə cavab verildi. Genişmiqyaslı təxribatların qarşısının alınması zamanı şəhid olan 80 hərbi qulluqçumuz arasında 2013-2017-ci illərdə ADPU Ağcabədi filialının tələbəsi olmuş Namiq Məmmədli də var. Cənab Prezidentin də artıq dəfələrlə vurğuladığı kimi biz tarixi ədaləti, beynəlxalq hüququ bərpa etdik. Uzun illər sürən işğala son qoyduq. Bu qələbəni bizə qazandıran igid oğullarımız, şəhidlərimiz, qazilərimiz və neçə-neçə qəhrəmanlarımız oldu. Bizə bu tarixi zəfəri yaşadan bütün şəhidlərimizə Allahdan rəhmət diləyir, onların ailələrinin qarşısında baş əyir, qazilərimizə isə uzun ömür və can sağlığı arzu edirəm. 2020-ci ilə qədər 20 faizə yaxın torpaqlarımızın işğal tarixlərini öyrənən biz gənc müəllimlər artıq gələcək nəsillərə zəfər tariximizi və bizə bu əvəzolunmaz anları yaşadan qəhrəmanları, sarsılmayan "Dəmir Yumruğu" öyrədəcəyik.

İsmayıl NƏSİROV

## SƏNDƏN ÖTRÜ CAN VERMƏYƏ CÜMLƏ HAZIRIZ

2022-ci ilin sentyabrın 12-dən 13-nə keçən gecə Ermənistan Silahlı Qüvvələrinin bölmələrinin dövlət sərhədimizin Daşkəsən, Kəlbəcər və Laçın istiqamətlərində genişmiqyaslı təxribatlarının qarşısının alınması zamanı ümumilikdə 80 hərbi qulluqçumuz şəhidlik zirvəsinə ucalıb. Onların içərisində 2013-2017-ci illərdə ADPU-nun Ağcabədi filialının tələbəsi olmuş Məmmədli Namiq Ağəmməd oğlu da var. Namiq və bütün şəhidlərimizə Allahdan rəhmət diləyir, yaxınlarına dərin hüznlə başsağlığı veririk.

Qeyd edək ki, Namiq Məmmədli Vətən müharibəsində böyük şücaət göstərmiş, Azərbaycan Respublikasının Prezidenti, Silahlı Qüvvələrin Ali Baş Komandanı cənab İlham Əliyev tərəfindən "Hərbi xidmətdə fərqlənməyə görə", "Şuşanın azad olunmasına görə", "Kəlbəcərin azad olunmasına görə", "Cəbrayılın azad olunması görə", "Füzulinin azad olunmasına görə" və "Xocavəndin azad olunmasına görə" medalları ilə təltif olunmuşdur.




## Redaksiya heyəti



Qəzet "Gənc Müəllim" qəzetinin redaksiyasında yığılıb, səhifələnib və "Azərbaycan Nəşriyyatı"nda çap olunub. Sifariş №: 2884

Ünvan: Bakı şəhəri, Səbail rayonu, Ü.Hacıbəyli küçəsi, 68 / Əlaqə: +994 50 868 08 33 / Qəzetdə qeyd edilən faktlara görə redaksiya məsuliyyət daşımır.